© *"Metafizika" Journal* *p-ISSN 2616-6879*
*Vol 6, issue 1, serial 21, 2023. pp.222-230* *e-ISSN 2617-751X*

**UOT:** 7203.01; 297(479.24)
**KBT:** 71; 111.153.0(2A)
**MJ №** 165

# Heydər Əliyev və Azərbaycan multikulturalizmi

**Aygün Kərimova***

**Abstrakt.** Bir tarixi şəxsiyyət olaraq Heydər Əliyev Azərbaycan multikulturalizminin siyasi banisidir. Sovet imperiyasınının süqutundan sonra müstəqilliyini yenidən bərpa edən Azərbaycanda dövlət və din münasibətlərində uğurlu qərarlar alınmağa başladı. Bu zaman nəinki İslam dini mənsublarına, eləcə də Azərbaycanda tarixən yaşayan müxtəlif dini inanc sisteminə malik olan etnik xalqların din və vicdan azadlığı məsələrinə də diqqət yetilməyə, onların bu sahədə hüquqlarının təmin edilməsinə nəzarət artırıldı. Müxtəlif dini konfessiyaların yaşadığı qədim Azərbaycan torpaqlarında tarixən yaşayan xalqların hər zamankı kimi, sülh, əmin-amanlıq və anlayış içərisində yaşamalarını davam etdirmək üçün Ulu öndərin əsasını qoyduğu xüsusi dövlət siyasəti bu gün də öz bəhrəsini verməkdədir.

**Açar sözlər:** Heydər Əliyev, multikulturalizm, mənəvi dəyərlər, din, tolerantlıq

## 1.Giriş

Tarixdə elə şəxsiyyətlər vardır ki, onların varlığı nəinki xalqı üçün eləcə də ümumilikdə bəşəriyyət üçün bir ərməğandır. Və tarixdə yalnız ziyalı şəxsiyyətlər xalqının yaddaşında dahilər silsiləsinə qoşularaq qalır .Bu gün biz də tarixdə iz salan şəxsiyyətlər içərisində xalqımızın dahi oğlu, misilsiz təəssübkeşi olan Heydər Əliyev kimi bir dövlət liderinə sahib olduğumuz üçün çox şanslıyıq. Dövlətini, torpağını və xalqını sevən hər bir insan, hər bir lider onu ayrı-ayrı bölgələrə, etnik xalqlara, konfessiyalara bölmədən sevir. Biz bu sevgi və hörmət nümunəsini məhz Heydər Əliyevin simasında daha aydın təcəssüm etdiyini gördük.

Bir tarixi şəxsiyyət olaraq Heydər Əliyev həm də Azərbaycan multikulturalizminin siyasi banisidir.Sovet imperiyasınının süqutundan sonra

---

* Fəlsəfə üzrə fəlsəfə doktoru, dosent,
Bakı Dövlət Universitetinin "Sosial Elmlər və Psixologiya" fakültəsinin "Fəlsəfə kafedrası"nın dosenti; Bakı, Azərbaycan
E-mail: aygunxalilqizi@mail.ru
https://orcid.org/0000-0002-1781-8904
**Məqaləyə istinad:** Kərimova, A. [2023] Heydər Əliyev və Azərbaycan multikulturalizmi. *"Metafizika" jurnalı, 6*(1), səh.222-230.

***Məqalənin tarixçəsi:***
*Məqalə redaksiyaya daxil olmuşdur: 31.01.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 28.02.2023*
*Çapa qəbul edilmişdir: 13.03.2023*

müstəqilliyini yenidən bərpa edən Azərbaycanda dövlət və din münasibətlərində uğurlu qərarlar alınmağa başladı. Bu zaman nəinki İslam dini mənsublarına eləcə də Azərbaycanda tarixən yaşayan müxtəlif dini inanc sisteminə malik olan etnik xalqların din və vicdan azadlığı məsələlərində də onların bu sahədə hüquqlarının təmin edilməsi nəzərə alındı.

Müasir dünyada tolerantlıq və multikulturalizmin əsas mərkəzlərindən biri hesab olunan Azərbaycanda dövlət-din münasibətlərinin müasir inkişaf mərhələsi xalqımızın 18 oktyabr 1991-ci ildə dövlət müstəqilliyimizi bərpa etdiyimiz dövrdən başlayır. Bu dövr xalqımız üçün elə bir dövr idi ki, millətin, xalqın demək olar ki, ən çətin və həlledici günləri hesab oluna bilər. Müharibənin yaratdığı iqtisadivə siyasi vəziyyət bir tərəfdən, digər tərəfdən isə bu vəziyyətdən istifadə etməyə çalışan xaricdən və daxildən hər cəhdlə ölkəni parçalmağa çalışan məkrli qüvvələrin maraqları ölkəmizin üçün böyük bir tarixi imtahandan keçdiyini göstərirdi.

Müstəqilliyin ilk illərində dövlət-din münasibətlərində baş verən müsbət dəyişikliklərlə yanaşı, qanunvericilikdə mövcud olan boşluqlardan öz məkrli məqsədləri üçün istifadə etməyə çalışan destruktiv qruplar da meydana çıxdı. Xaricdəki bəzi dairələr tərəfindən idarə olunan həmin qruplar ənənəvi milli-mənəvi dəyərlərimizə qarşı çıxaraq ifrat dini ideyaları və dözümsüzlüyü təbliğ edir, bununla da cəmiyyətdə dini zəmində ayrı-seçkilik və ədavət salmağa, ictimai-siyasi sabitliyi pozmağa səy göstərirdilər. Hətta Azərbaycanın bu ağır iqtisadi böhran keçirdiyi günlərindən istifadə edən qüvvələr, missioner təşkilatlar yenicə müstəqilliyini elan etmiş lakin ağır iqtisadi çətinliklər yaşayan, xüsusən də Azərbaycanın rayonlarında, ucqar kəndlərində əhalinin sosial vəziyyətlərindən istifadə etməyə çalışaraq vəd etdikləri maddi qarşlıq əvəzində onların inanclarına, dini seçimlərinə müdaxilə edərək, xüsusən də əhalinin tarixən inandığı İslam inancından döndərməyə çalışırdılar.

Xarici qüvvələr yaxşı bilirdilər ki, tarixən Qafqazda, eləcə də Azərbaycanda birgəyaşayışın ən gözəl örnəyini yaşayan xalqımızın həyatında dinin, xüsusilə də İslamın rolu nə qədər mühümdür. Birgəyaşayış ənənəsinin dağıdılması Azərbaycanın parçalanması, dağıdılması demək idi. Bu boşluqları doldurmaq isə müstəqilliyini yenicə qazanan bir dövlət üçün olduqca çətin olduğuna görə qanunvericilikdə olan bəzi boşluqları doldurmaq üçün müvafiq addımlar atılmalı idi. Bu məqsədlə 20 avqust 1992-ci ildə “Dini etiqad haqqında” Azərbaycan Respublikasının Qanunu qəbul olunaraq dini qurumların statusu, hüquq və vəzifələri müəyyənləşdirildi. Ancaq dövlət-din münasibətlərinin tənzimlənməsi sahəsində əsaslı irəliləyiş ulu öndər Heydər

Əliyevin 15 iyun 1993-cü ildə siyasi hakimiyyətə ikinci dəfə gəlişi ilə baş vermiş oldu.

Ulu öndər hakimiyyətə yenidən qayıtdıqdan sonra dövlət-din münasibətlərinin tənzimlənməsi, dini sahəsindəki problemlərin həlli və sabitliyə nail olunması, eyni zamnda də milli-mənəvi dəyərlərimizin qorunması, tarixən ölkəmizdə mövcud olan tolerant və multikultural adət-ənənələrin qorunaraq inkişaf etdirilməsi istiqamətində hərtərəfli, əhəmiyyətli tədbirlər həyata keçirdi. Eyni zamanda, ölkəmizi dini zəmində parçalamaq, mənəvi cəhətdən zəiflətmək, məzhəb ayrı-seçkiliyi salmaq istəyən qüvvələrin niyyətlərini puç etdi, etnik dini mənsubiyyətindən asılı olmayaraq bütün vətəndaşlarımızı bu torpaqlarda tarxiən birgə yaşayan xalqlar olaraq, dövlətin himayəsində və azərbaycançılıq məfkurəsi altında birləşdirilməsini əsas götürdü.

**2.Heydər Əliyev və dövlətin multikulturalizm siyasəti**

Dövlət və din din münasibətləri ən mühüm addımları Heydər Əliyevin sayəsində 1995-ci ildə atıldı. Həmin il 12 noyabr tarixində ümummilli liderin rəhbərliyi ilə hazırlanan Azərbaycan Respublikasının Konstitusiyası ümumxalq səsverməsi yolu ilə qəbul edildi. Qəbul edilən Konstitusiyda dövlət-din münasibətlərinin əsas prinsipləri müəyyənləşdirildi. Azərbaycan Respublikasının Konstitusiyasında dövlət və din münasibətlərini şərh edən müddəalara nəzər yetirsək görərik ki,. Konstitusiyanın 7-ci maddəsində Azərbaycan dövlətinin demokratik, hüquqi, dünyəvi, unitar respublika olduğu göstərilir.

Həmçinin Konstitusiyanın 18-ci maddəsində Azərbaycan Respublikasında dinin dövlətdən ayrı olduğu bildirilərək dövlətimizin dünyəvi quruluşa malik olduğu bir daha vurğulanır. Həmin maddədə bütün dini etiqadların qanun qarşısında bərabər olduğu, dövlət təhsil sisteminin dünyəvi xarakter daşıdığı bəyan edilərək respublikamızda insan ləyaqətini alçaldan, insanpərvərlik prinsiplərinə zidd olan dinlərin və dini cərəyanların təbliğinə qadağa qoyulduğu qeyd olunur.

Azərbaycan xalqı yenidən müstəqilliyini bərpa etdikdən sonra ölkəmizdə dini etiqad və vicdan azadlığı təmin olunmasından sonra ulu öndər Heydər Əliyevin hakimiyyətə qayıdışı ilə ölkəmizdə etnokonfessional durumun tənzimlənməsi sahəsində müsbət irəliləyişlər baş verdi.

Ulu öndər haqlı olaraq multikulturalizm siyasətini ölkənin demokratik inkişafının tərkib hissəsi hesab edirdi. O, Azərbaycan ərazisində yaşayan milli azlıqların hüquq və azadlıqlarının, o cümlədən etnik-mədəni, dini dəyərlərinin qorunmasını demokratiyanın mühüm prinsipi olan əsas insan hüquq və azadlıqları kontekstində görürdü [Multikulturalizmə giriş. 2019].

Azərbaycan xalqı müstəqillik qazandıqdan sonra əsas məsələlərdən biri də ölkədə tolerantlıq və multikulturalizm məsələsinin dövlət tərəfindən nizama salınması məsələsi idi. Çünki, XX əsrin sonlarında istər dünyada, istərsə də postsovet məkanında milli münaqişələrin artdığı bir zamanda müstəqillik yoluna qədəm qoymuş gənc bir dövlət üçün tolerantlıq və multikulturalizm kimi həssas məsələ olduqca vacib idi.

Nəzərə alsaq ki, Azərbaycan tarixən tolerantlıq və multikulturalizm diyarı olub və xalqımızın tarixi qədər onların da tarixi qədimdir, o zaman multikulturalizm və tolerantlığın dövlət tərəfindən tənzimlənməsi yeni qurulmaqda olan vətəndaş cəmiyyəti üçün zəruri idi. Müdrik rəhbər uzaqgörənliklə insan təfəkküründə baş verən böhranlı məqamlar içərisində ən önəmlisinin insan fikrinin və bəşəri ideyaların transformasiyası olduğunu görürdü.

Heydər Əliyevin multikultural siyasətini addım-addım izlədiyimiz zaman nə qədər müdrik yollarla xalqlar arasındakı dostluğu və ölkədəki sabitliyi qorumaq üçün böyük səylər göstərdiyinə bir daha şahid oluruq.1998-ci ilin oktyabr ayında Bakıda dahi liderin iştirakı ilə “Müasirlik və dini mənəvi dəyərlər” mövzusunda beynəlxalq konfrans və Qafqaz müsəlmanlarının X qurultayı keçirildi.

Bu qurultayda nəinki Qafqazın bütün bölgələrindən eyni zamanda Türkiyə, Rusiya Latviya, Estoniya, Ukrayna və Latviyadan da din xadimləri iştirak etmişdilər. Əgər nəzərə alsaq ki, Qafqazda yaşayan xalqlar içərisində İslam dininə inanan insanlar çoxluq təşkil edir, bu baxımdan İslamın regionda mənəvi gücə sahib olmasından, İslamın mənəvi, bəşəri dəyərlərindən istifadə edərək xalqlar arasındakı nufuzu ilə sabitlik yaratmaq özü də bir uzaqgörən siyasətin göstəricisi idi.

Ümumiyyətlə, Bakıda keçirilən “Müasirlik və dini mənəvi dəyərlər” mövzusunda beynəlxalq konfrans və Qafqaz müsəlmanlarının X qurultayı Qafqazda sülhün, əmin-amanlığın təhlükəsizliyin və əməkdaşlığın təmin olunmasında müstəsna əhəmiyyət kəsb etmişdir.Heydər Əliyev keçirilmiş hər iki tədbiri Qafqaz müsəlmanlarının daha sıx birləşməsi, dayaq olması üçün böyük bir mərhələ hesab etmişdir [İradə Hüseynova. 2008. s.566].

Heydər Əliyevin Azərbaycanda multikultural siyasətin həyata keçirilməsi və möhkəmləndirilməsi yolunda atdığı addımlar içərisndə növbəti addım Qafqazda İslam sivilizasiyasına dair keçirilən beynəlxalq Bakı simpoziumu oldu.Bu məqsədlə 1998-ci il dekabr ayında “İslam sivilizasiyası Qafqazda” adlı böyük əhəmiyyət daşıyan bir simpozium keçirildi. Bu simpoziumda tolerantlıq və bütün dinlərə, mədəniyyətlərə qarşı hörmətin Azərbaycanlılar

üçün başlıca xarakter daşıdığını razılıqla qeyd etmiş və əlavə olaraq bu fikirlərini də söyləmişdir:

*“Dünyada bir çox böyük dinlər mövcuddur. Hər dinin özünəməxsus yer var. Biz azərbaycanlılar İslam dini ilə fəxr edərək, eyni zamanda heç vaxt başqa dinlərə qarşı mənfi münasibət göstərməmişikdüşmənçilik etəmişik, ədavət aparmamışıq və heç bir başqa xalqı da öz dinimizə itaət etməyə məcbur etməmişik”* [Heydər Əliyevin “İslam sivilizasiyası Qafqazda” simpoziumundakı nitqindən. 2002.№6)].

Bu tarixi çıxış onun öz dini inancı ilə fəxr etməsini göstərir və ümummilli lider İslami dəyərlərin xarakterik xüsusiyyətini bütün xalqımızın simasında əsrlərcə təzahür edərək yaşadıldığını qürur hissi ilə dilə gətiririrdi.

Heydər Əliyevin 13 avqust 2001-ci il tarixində isə tarixi praktiki əhəmiyyətə malik olan bəyənatı milli-mənəvi dəyərlərin qorunub saxlanması ilə bağlı idi. Bu bəyənatda deyilirdi *“Hər xalqın öz adət -ənələri öz milli-mənəvi dəyərləri var. Biz öz milli-mənəvi dəyərlərimiz ilə fəxr edirik”* [Heydər Əliyev din və mənəvi dəyərlər haqqında. 2002.№1 (3)].

Ulu öndər həmişə öz çıxışlarında Azərbaycanın çoxmillətli ölkə olmasını, etnik rəngarəngliyini və tolerantlığa böyük əhəmiyyət verməsini xalqımızın böyük sərvəti hesab etmişdir: *“Azərbaycan əhalisinin çoxmilli tərkibi bizim sərvətimizdir, üstünlüyümüzdür... Dövlət, ölkə nə qədər çox xalqı birləşdirsə, bir o qədər zəngin olur, çünki onların hər biri ümumdünya mədəniyyətinə və sivilizasiyasına öz töhfəsini verir. Azərbaycan onun ərazisində yaşayan bütün millət və xalqların ümumi vətənidir. Azərbaycanlı sözü bizi həmişə birləşdirib”*.

Azərbaycan tarixən müxtəlif mədəniyyətlərə, dinlərə, azsaylı xalqalara münasibətini tolerant davranışını açıq şəkildə nümayiş etdirən bir ölkə olmuşdur. Yerləşdiyi coğrafi məkan, insanlarının digər xalqlara qarşı münasibətdəki həlim xarakteri sonradan da buraya axın edın insanlar üçün əlverişli həyat şəraitinin yaradılması da çox mədəniyyətliliyin həyat tərzinə çevrilməsinə təkan verən amillərdən olmasına gətirib çıxardı. Hər bir ölkədə müxtəlif xalqaların yaşama səbəbləri sadəcə tarixən yaşama səbəbi deyil, sonradan ölkəyə müharibə və ya üçüncü, qeyri-dövlətlərin xüsusi siyasəti olaraq da köçürülən xalqlar ola bilir. Buna əyani sübut kimi ermənilərin XIX əsrdə xüsusi bir siyasət məqsədilə köçürülməsini qeyd edə bilərik. Məhz bu köşetmə səbəbiləxalqımızın 200 ildə başına gətirilən faciələr hər birimizə məlumdur.

Azərbaycan multikulturalizminin özünəməxsus bir sıra xüsusiyyətləri vardır. Əsrlərdən bəri formalaşan, eyni zamanda ictimai-bədii, psixoloji-mənəvi dəyərlərlə zəngin olan Azərbaycan multikulturalizmi milli

özünəməxsusluqla şərtlənmişdir. Azərbaycan multikulturalizminin fəqlililiyi, möhkəmliyi və davamlılığının əsas səbəbi nikbin ruhda tətbiq olunan dövlət siyasətinə bağlıdır.

Azərbaycanda digər ölkələrdə olduğu kimi bir sosial hadisə kimi meydana gələn multikulturalizm özünün sonrakı inkişaf mərhələrində dövlət siyasəti müstəvisinə yerləşdirilmişdir [Multikulturalizmə giriş, 2019. s.414]. Multikulturalizmin dövlət siyasətinə çevrilməsi xalqımızın milli xüsusiyyətindən irəli gələn cəmiyyətdəki etnik-mədəni müxtəlifliyə xalqın tolerant münasibəti ilə daha güclənmişdir.

1990-cı illərdə, birinci Qarabağ savaşı dövründə Azərbaycan xalqını parçalmağa çalışan ünsürlər xalqın içində müxtəlif etnik birliklərin, azsaylı xalqların xüsusi öyrədilmiş qruplarının əli ilə ixrişaşlar, qarışıqlıqlar yaratmağa çalışırdılar. Və bu böyük təhlükə qarşısında sadəcə düzgün siyasi manevrlər və bacarıqlı lider tədbirləri köməyə gələ bilərdi.

**3.Nəticə**

Azərbaycanın multikulturalizm modelinin özünəmxsus luğunun bir sıra fərqli keyfiyyətləri vardır. Bu modelin özünəmxsusluğunun əsas səbəbi ondan ibarətdir ki. Ulu öndər Heydər Əliyev ilk növbədə multikulturalizmin siyasi modelinin assimilyasiya və izolyasiya kimi modelinin mümkün siyasi modellərdən üstün olduğunu bütün dünyaya nümayiş etdirdi.

Heydər Əliyevin etnik və dini mənsubiyyətindən asılı olmayaraq bütün vətəndaşlara vahid Azərbaycan dövlətinə mənsub olmalarının əsasında birlik hissi aşılanmanın vacibliyini önə çəkdi. "Azərbaycan əhalisinin çoxmilli tərkibi bizim sərvətimizdir, üstünlüyümüzdür. Biz bunu qiymətəndiririk və qoruyub saxlayacağıq" deyən Ulu Öndər multikultural ənənlərin qorunmasını hüquqi sənədlərlə də daha da möhkəmlətdi.Azərbaycan Respubliksaının Konstitusiyasında şərtlənən qanun və maddələrlə dövlətin bu yöndə planlaşdırdığı və həyata keçirtiyi dövlət siyasəti bir sıra maddələrlə öz əksini tapdı: "Din və dövlət" (Maddə 18, bənd 1); "Dövlət dili" (Maddə 21, bənd 2); "Bərabərlik hüququ" (Maddə 25, bənd 3); "Milli mənsubiyyət hüququ" (Maddə 44, bəndlər1, 2); "Ana dilindən istifadə hüququ" (Maddə 45, bəndlər 1, 2); "Fikir və söz azadlığı" (Maddə 47, bəndlər 1, 2, 3); "Vicdan azadlığı" (Maddə 48, bəndlər 1-2); "Hakimlərin müstəqilliyi, ədalət mühakiməsinin həyata keçirilməsinin əsas prinsipləri və şərtləri" (Maddə 127, bənd 10)

Bu ölkədə yaşayan bütün xalqlara qarşı qanunlar çərçivəsində münasibət göstərən Heydər Əliyev Azərbaycanın çoxmillətli dövlət olaraq milli siyasətinin əsas məzmununu belə müəyyən etmişdir: *"...Respublikamızın ən başlıca sərvəti əsrlərdən bəri bu torpaqda yaşayan, öz taleyini, öz həyatını bu torpağa bağlayan, müxtəlif millətlərdən olan, müxtəlif dinlərə etiqad edən*

*adamlardır. Ölkə nə qədər çox xalqı birləşdirsə, bir o qədər zəngin olar”* [Niftiyev N. 2015. s54].

Bünövrəsi ümummilli lider tərəfindən qoyulan bütün bu tolerantlıq ənənələrinin dünyada təqdim edilməsi işində Azərbaycan dövləti bu gün regionda özünəməxsus siyasi xətlə hərəkət edir. Multikultural siyasət nümunəsi ilə sabitliyin, sülhün qorunmasında islami dəyərləri təlqin edən bəşəriyyəti mərhəmətə, qarşılıqlı köməyə, sülhə çağıran bir dövlət siyasəti ilə davam etmək dövlətimizin ən ümdə vəzifələrindən biridir. Əsrlər boyu iki dünyanın Avropa və Asiyanın təkcə coğrafi deyil, həm də mədəni baxımdan “kəsişmə nöqtəsində” yerləşən Azərbaycanda multikultural dəyərlərin qorunub saxlanılmasına xidmət edən siyasi kurs, bu gün də uğurla aparılır.Bu məqsədlə Azərbaycan multikulturalizminin bir ölkə daxilində qapalı inkişafını deyil, ümumilikdə dünya çərçivəsində dinlərin və mədəniyyətlərin müxtəliflikləri şəraitdə fəaliyyət göstərməsini reallaşdırmaq üçün müxtəlif proqramlar işlənib hazırlanır.Bu da ondan irəli gəlir ki, ölkəmizdə tarixən formalaşmış tolerantlıq və dözümlülük Azərbaycan cəmiyyətini səciyyələndirən gözəl bir ənənəyə çevrilib.

## ƏDƏBİYYAT

**1.** *Heydər Əliyev din və mənəvi dəyərlər haqqında*, Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin bülleteni, 2002. №1 (3).
**2.** *Heydər Əliyevin Bakıda keçirilən “İslam sivilizasiyası Qafqazda” mövzusunda beynəlxalq simpoziumdakı (9-11 dekabr 1998-ci il) nitqindən,* Dini qurumlarla iş üzrə Dövlət komitəsinin bülleteni. 2002. №6.
**3.** Hüseynova, İ. (2008). *Heydər Əliyev və Qafqazda sülh prosesi*. Bakı.
**4.** *Multikulturalizmə giriş*, Ali məktəblər üçün dərslik, Bakı 2019.
**5.** Niftiyev, N. (2015). *Azərbaycanda birgəyaşayış və multikulturalizm*. Bakı.

## Гейдар Алиев и мультурализм Азербайджана

**Айгюн Каримова***

* Кандидат философских наук, доцент,
Доцент кафедры «Философии» факультета Социальных Наук и Психологии Бакинского Государственного Университета; Баку, Азербайджан
E-mail: aygunxalilqizi@mail.ru
https://orcid.org/0000-0002-1781-8904

**Цитировать статью:** Каримова, А. [2023]. Гейдар Алиев и мультурализм Азербайджана. *Журнал «Metafizika», 6*(1), с.222-230.

***История статьи:***
*Статья поступила в редакцию: 31.01.2023*
*Отправлена на доработку: 28.02.2023*
*Принята для печати: 13.03.2023*

**Абстракт.** Как историческая личность Гейдар Алиев является политическим основоположником азербайджанского мультикультурализма. После падения советской империи в Азербайджане, восстановившем свою независимость, были приняты успешные решения в отношениях между государством и религией. В то время в вопросах свободы вероисповедания и совести учитывались не только представители исламской религии, но и права разных этнических народов с различными системами религиозных убеждений, исторически проживающих в Азербайджане. Особая государственная политика, установленная Великим Лидером для проживания в мире, безопасности и понимании народов и различных религиозных конфессий, исторически проживающих на древних землях Азербайджана, продолжает приносить свои результаты и сегодня.

**Ключевые слова**: Гейдар Алиев, мультикультурализм, нравственные ценности, религия, толерантность

## Heydar Aliyev and Azerbaijan's multiculturalism

**Aygun Karimova***

**Abstract.** As a historical figure, Heydar Aliyev is the political founder of Azerbaijani multiculturalism. After the fall of the Soviet empire in Azerbaijan, which regained its independence, successful decisions were made in relations between the state and religion. At that time, in matters of freedom of religion and conscience, not only representatives of the Islamic religion were taken into account, but also the rights of ethnic peoples historically living in Azerbaijan with different systems of religious beliefs. The special state policy established by the great leader in order to continue to live in peace, security and understanding, as always, in the ancient lands of Azerbaijan, inhabited by various religious denominations, continues to bear fruit today.

**Keywords:** Heydar Aliyev, multiculturalism, moral values, religion, tolerance

* Doctor of Philosophy in Philosophy, Associate Professor,
Associate Professor of the Department of Philosophy of the Faculty of Social Sciences and Psychology, Baku State University; Baku, Azerbaijan
E-mail: aygunxalilqizi@mail.ru
https://orcid.org/0000-0002-1781-8904

**To cite this article:** Karimova, A. [2023]. Heydar Aliyev and Azerbaijan's multiculturalism. *“Metafizika” journal, 6*(1), pp.222-230.

***Article history:***
*Received: 31.01.2023*
*Accepted: 13.03.2023*

## REFERENCES

**1.** *Heydar Aliyev on religion and moral values*. Bulletin of the State Committee on Work with Religious Institutions, 2002. No. 1 (3).
**2.** *Heydar Aliyev's speech at the international symposium on "Islamic civilization in the Caucasus" held in Baku (December 9-11, 1998).* bulletin of the State Committee on Work with Religious Institutions. 2002. No. 6.
**3.** Huseynova, I. (2008). *Heydar Aliyev and the peace process in the Caucasus.* Baku.
**4.** *Introduction to multiculturalism*. textbook for higher schools, Baku 2019.
**5.** *Introduction to multiculturalism*. Baku 2019.
**6.** Niftiyev, N. (2015). *Coexistence and multiculturalism in Azerbaijan*. Baku.